ISSN: 2710-9960 (Print)
ISSN: 2710-8432 (Online)
JOURNAL OF "HISTORY OF SCIENCE"
Cild 2, Say 1, Sıra 3, 2021, 90-93

**MÜSAHİBƏ**

# ÖLKƏMİZİN İXRAC POTENSİALINI ARTIRMAQ ÜÇÜN ÖZƏL SEKTORA DÖVLƏT DƏSTƏYİ ARTIRILMALIDIR



***Son dövrlər dünya və regional gündəm olduqca gərgindir. Hələ də bəşəriyyəti cənginə almaqda davam edən COVID-19 pandemiyası fonunda dünyanın qarşılaşdığı ağır siyasi-iqtisadi mənzərə, səhiyyə sisteminin sınaq qarşısında qalması, iş yerlərinin bağlanması, iqtisadiyyatda baş verən durğunluq və geriləmə insanları ciddi narahat edən məsələlərdir.***

***Pandemiya dövründə dünya ölkələrinin iqtisadiyyatı hər gün milyonlarla dollar itki ilə üzləşir. İqtisadiyyat naziri Mikayıl Cabbarov Nazirlər Kabineti yanında Operativ Qərargahın kütləvi informasiya vasitələrinin nümayəndələri üçün keçirilən brifinqdə koronavirus pandemiyasının hər gün ölkə iqtisadiyyatına 120-150 milyon manat civarında itkilərə başa gəldiyini bildirmişdir.***

***Ümumilikdə COVID-19 pandemiyasının yaratdığı fəsadlar, texnoloji yeniliklərin işsizliyə təsiri, alternativ enerji mənbələri, qloballaşan dünyanın problemləri, 44 günlük müharibə nəticəsində işğaldan azad edilən ərazilərin ölkə iqtisadiyyatına təsiri kimi önəmli mövzularla bağlı iqtisadçı-ekspert, hörmətli Natiq Allahverdiyevə bir sıra suallar ünvanladıq.***

**Hörmətli Natiq müəllim, necə düşünürsünüz pandemiya dövründə hansı addımlar atmaqla qeyd olunan itkiləri minimuma endirmək olar?**

Suala cavab verməzdən öncə onu nəzərə çatdırım ki, arzumuz budur ki bəşəriyyət tezliklə bu pandemiya bəlasını geridə qoysun və normal həyata qayıtsın. Pandemiya səbəbindən dünyasını dəyişən bütün insanlara Allahdan rəhmət, xəstələrə isə şəfa diləyirəm. Xəstəlik tüğyan etməyə başlayandan sonra dünya dövlətləri əsasən iki istiqamət haqqında daha çox düşünməyə başladılar. İqtisadiyyatı, yoxsa insanları xilas etməli? Bir çox ölkələrdə olduğu kimi Azərbaycan hökuməti də insanların sağlamlığını əsas götürərək qapanma ilə bağlı qərarlar verdi. Bu isə iş yerlərinin qismən və ya tamamilə bağlanmasına, iqtisadi aktivliyin azalmasına gətirib çıxardı. Nəticə etibarı ilə hər gün dünya ölkələri milyonlarla dollar itki verdi. O cümlədən də AR İqtisadiyyat naziri, hörmətli Mikayıl Cabbarovun çıxışların birində dediyi kimi, Azərbaycan iqtisadiyyatı da hər gün 120-150 milyon manat civarında itkilərlə üzləşmişdir. Bütün bunlara baxmayaraq, Azərbaycanda vaxtında atılan zəruri addımlar pandemiyanın fəsadlarını minimuma endirdi. Neftin qiyməti kəskin aşağı düşsə də, bütün sosial öhdəliklər yerinə yetirildi, sosial infrastruktur layihələrin icrası təmin edildi. Yürüdülən uğurlu siyasət nəticəsində Ali baş komandanın rəhbərliyi altında 44 günlük müharibə ilə torpaqlarımızın işğaldan azad edilməsinə nail olduq. Təbii ki, müharibə aparmaq miqyasından asılı olaraq hər gün milyonlarla manata başa gəlir və bu da büdcəyə əlavə yükdür. Pandemiya özü ilə bir sıra iqtisadi və sosial fəsadlar yaratdı. Azərbaycan prezidenti İlham Əliyev İqtisadi inkişaf naziri Mikayıl Cabbarovu qəbul edərkən bu məsələyə də diqqət çəkdi. Cənab prezident Nazirlər Kabinetinə bu məqsədlə 1 milyard manat vəsait ayrıldığını, məşğulluq məsələlərini təhlil edərək təkliflər verməsi üçün 4 işçi qrupunun yaradıldığını bildirdi. Bu

komissiyanın işi isə iqtisadi sabitliyi və inkişafı təmin etmək, makroiqtisadi sabitliyi qorumaq və maliyyə vəziyyətini təhlil etmək idi. Məhz qeyd etdiyim bu kimi addımlar nəticəsində biz pandemiya dövründə iqtisadi və sosial fəsadları aradan qaldırmağa nail olduq.

**Bildiyimiz kimi, dünya getdikcə alternativ enerji mənbələrinə üstünlük verməklə neftdən asılılığını azaltmağa çalışır. Bu isə müəyyən mənada iqtisadiyyatı neft məhsullarından asılı olan ölkələr üçün ciddi problemlərin yaranmasına gətirib çıxara bilər. Azərbaycanın da ixrac məhsullarının əsasını neft və neft məhsullarının təşkil etdiyini nəzərə alsaq, azalan neft gəlirləri fonunda hansı məhsulların ixracına üstünlük verməklə bunu kompensasiya etmək olar?**

Uzun zaman ənənəvi enerji resursları olan neft-qaz bəşəriyyətin enerji təhlükəsizliyinin qarantı rolunda çıxış edib desək, yanılmarıq. Lakin bir tərəfdən ənənəvi enerji resurslarının tükənməsi və digər tərəfdən isə ətraf mühitə çox böyük ziyanlar vurması bərpa olunan enerji növlərindən istifadə zərurəti yaratmışdır. Ona görə də inkişaf etmiş ölkələr və dünya sənayesinin önündə gedən Amerika, Almaniya və İngiltərə kimi dövlətlər ətraf mühiti qorumaq üçün alternativ enerji mənbələrinə keçməyi məqsədəuyğun hesab edirlər. Bununla da atmosferin çirklənməsinin qarşısını almağa, Yer kürəsi və cəmiyyəti mümkün risklərdən qorumağı düşünürlər. Dünya ölkələrində alternativ enerji mənbələri hesab edilən atom və su elektrik stansiyaları, günəş batareyaları, küləkdən alınan enerji, hidrogen enerjisi, ölkəmizdə də rast gəlinən termal sulardan istifadə, habelə avtomobil və digər nəqliyyat vasitələrinin neft və qazı əvəzləyəcək resurslarla istifadəsi artdıqca bu, eləcə də qeyd etmədiyimiz digər amillər neft və qaza olan tələbatı azaltmış olur. Tələbatın azalması qiymətlərin enməsinə də təsirsiz ötüşmür. Beləliklə də neft və qaz ehtiyatları ilə zəngin olan Azərbaycan, İran, Səudiyyə Ərəbistanı, Küveyt və İraq kimi ölkələrin gəlirlərinə təsir göstərmiş olur. Bu isə həmin ölkələri təbii olaraq düşünməyə vadar edir. Necə edək ki, azalan neft gəlirləri fonunda iqtisadiyyatımızı dirçəldə bilək. Hələ uzun illər öncə ölkə başçımız İlham Əliyev büdcənin neftdən asılılığını azaltmaq yönündə çağırışlar edir və bunun üçün praktiki addımlar atırdı.

Ümumiyyətlə ölkəmizin ixrac potensialını artırmaq üçün prosedurlar sadələşdirilməli, vergi güzəştləri tətbiq edilməli və özəl sektora dövlət dəstəyi artırılmalıdır. Ənənəvi bazarlarla yanaşı, alternativ bazarlara çıxış yolları da axtarılmalıdır. Rəqabət mühüti yaradılmalı və rəqabət qabiliyyətli sektorların hamısı dəstəklənməlidir. Xüsusilə də biz aqrar və sənaye sektorunu dəstəkləməklə buna nail ola bilərik. Eyni zamanda Azərbaycanın turizm potensialını da kənara qoymaq olmaz. Xüsusilə də işğaldan azad edilmiş ərazilərimizin turizm potensialının çox yüksək olduğu hamıya məlumdur.

**Dünya hər gün yenilənən texnoloji kəşflərin şahidi olur. Texnoloji yeniliklərin bütün müsbət tərəfləri ilə yanaşı, işsizlik kimi problemləri də yaratdığı hamıya məlumdur. Yeni texnologiyalar istehsalata tətbiq edildikcə, məcazi anlamda desək "*işsizlər ordusu*" yaranır. Dünya əhalisinin sayının hər ötən gün artması, bir çox peşə və məşğuliyyətlərin sıradan çıxaraq tarixin arxivinə qovuşması fonunda yeni yaradılan məşğuliyyət sahələri təbii ki, bu problemə adekvat cavab verə bilmir. Natiq müəllim, qeyd etdiyimiz bu problemi necə həll etmək olar ki, insanlar işlə təmin edilsin və işsizlikdən qaynaqlanan bir çox sosial-siyasi problemlər meydana çıxmasın?**

Tamamilə doğru qeyd etdiniz. Texnoloji kəşflər müəyyən mənada bir çox ənənəvi peşələrə ehtiyacı aradan qaldırdığı üçün onlar tarixin arxivinə qovuşurlar. İndi biz onlarla sahənin adını qeyd edə bilərik ki, bu

peşələrə ancaq tarixi sənədlərdə, əsərlərdə və muzeylərdə rast gəlirik. İşsizlik problemi həmişə cəmiyyətlər üçün aktual problem olaraq qalır. İşsizliyi doğuran bir sıra amillərə diqqət çəkmək istərdim. Bu səbəblər arasında biz yüksək inflyasiya, iqtisadi böhran, iqtisadiyyatın struktur yenidənqurulması, demoqrafik amillər və eləcə də texniki tərəqqini qeyd edə bilərik. Biz həm dünyada, həm də ölkəmizdə işsizliyin friksion, struktur, dövrü və s. formalarına rast gəlirik. İşsizlik problemləri və onun həlli yolları hökumətləri və siyasətçiləri daim düşündürən bir məsələdir. Təsadüfi deyil ki, Azərbaycan Respublikasının prezidenti cənab İlham Əliyev öz namizədlik platformasını açıqlarkən 600 min yeni iş yerinin yaradılacağını bildirmişdi. Prezident seçildikdən sonra da daim bu məsələni diqqət mərkəzində saxlayaraq şəxsən özü birbaşa istehsal sahələrinin açılışlarında iştirak edir, yeni iş yerlərinin yaradılmasına nə qədər önəm verdiyini nümayiş etdirir. Çünki işsizlik həm də ona görə aktualdır ki, özü ilə bir çox başqa problemləri "ərməğan" olaraq gətirir. İşsizlik gəlirdən məhrum olmaq, həyat intizamının pozulması, depressiya, özgüvənin itirilməsi, qorxu, narahatlıq kimi bir çox sosial, iqtisadi və psixoloji problemler yaradır. İşsizlik insanın gəlirdən məhrum olması kimi xarakterizə edilməklə yanaşı, həm də onun ailə və cəmiyyətdə gücünün itkisi hesab olunur ki, bunun özü də bir çox ailədaxili münaqişələrə gətirib çıxarır.

Bu problemlə mübarizə üsullarına gəldikdə isə, bildiyimiz kimi texnoloji cəhətdən bizdən öndə olan bir çox ölkələrin bu sahədə yürütdüyü siyasəti dərindən təhlil etmək və onların keçdiyi yola nəzər salmaq lazımdır. Həmin ölkələrin müvafiq sahədə qazandığı nailiyyətlərə və qarşılaşdığı problemlərə diqqət yönəltmək lazımdır.

Digər bir çıxış yolu kimi isə diqqəti universitetlərdə olan ixtisaslara yönəltmək istərdim. Bu ixtisasların monitorinqi aparılmalıdır ki, məsələn, 10, 20 və ya 30 il sonra hansı ixtisaslar sıradan çıxacaq. Bu ixtisaslar üzrə tədricən qəbul yerlərini azaltmaq, gələcəkdə populyarlıq qazana biləcək, cəmiyyət üçün lazım və zəruri olacaq ixtisaslara isə əlavə yerlər ayırmaq lazımdır. Çünki tələbələr bir sıra ixtisaslar üzrə təhsil aldıqdan sonra bu ixtisaslar öz aktuallığını itirmiş olur və həmin mütəxəssislər də qeyd etdiyiniz kimi "işsizlər ordusu"na qoşulmuş olur.

**Hər bir dövrün özünəxas problemləri olur. Qloballaşan bir dünyada yaşadığımızı və dünyanın getdikcə daha da qloballaşacağını nəzərə alsaq, sizcə bu gün dünyanın qarşısında həllini gözləyən hansı qlobal iqtisadi problemlər dayanır?**

Problemlər həmişə mövcuddur. Qlobal problemlər tək bir şəxsin, bir kəndin, bir şəhərin və ya bir ölkənin öhdəsindən gələ bildiyi problemlər deyil, onlar bütün dünyanı, bütün regionu əhatə edən, həlli üçün bütün dünyanın səylərini birləşdirməsini tələb edən, dövlətlər və cəmiyyətlərin birgə fəaliyyətini tələb edən problemlərdir. Bu gün dünya texnoloji nailiyyətlər sayəsində kiçik bir kəndə çevrilmişdir. Hazırda bəşər övladı qarşısında həllini gözləyən çox sayda qlobal problemlər mövcuddur. Əlbəttə, qlobal problemlərə hansı problemlərin daxil olması məsələsində fikir ayrılığı mövcud olsa da, bu, məsələnin aktuallığını azaltmır. İstənilən problem, xüsusilə də ekoloji problemler həll edilmədikcə daha çox fəsadları ilə qarşılaşırıq. Beynəlxalq terrorizm təhlükəsi, pandemiyalar, istilik-nüvə fəlakəti qorxusu, ətraf mühitin məhv edilməsi və s. problemlər artıq bir ölkənin həll edə biləcəyi problem deyil. İqtisadi sahədə də həllini gözləyən bir çox problemlər mövcuddur. Dünya əhalisi sürətlə artdıqca ərzaq probleminin həlli, aclıq, yoxsulluq, kütləvi xəstəliklər, əmək bazarında olan problemlər, işsizlik və s. probelmlər də müəyyən mənada həllini gözləyir. Əhalinin sayı artdıqca təbii resurslar üzərində mübarizə də güclənməyə başlayır. Bu isə yeni-yeni problemlərin meydana çıxmasına gətirib çıxaracaq. Dünyada şirin su ehtiyatının az

olması fonunda şirin su istehlakının artması da yeni problem kimi daha çox özünü qabarıq göstərəcək ki, bunun da həlli üçün mütləq zəruri addımlar atılmalıdır.

**Ali baş komandan cənab İlham Əliyevin rəhbərliyi altında 44 günlük müharibə nəticəsində torpaqlarımızı işğaldan azad etdik. Bu qələbə Azərbaycanı siyasi cəhətdən daha da gücləndirmiş oldu. Siyasi üstünlüklər iqtisadiyyata da təsirsiz ötüşməyəcək. Sizcə, işğaldan azad edilən torpaqlar Azərbaycan üçün iqtisadi baxımdan hansı imkan və fürsətlər yaratmış oldu?**

Ali baş komandan cənab İlham Əliyevin rəhbərliyi altında 44 günlük müharibə bizə bir çox siyasi, iqtisadi, psixoloji üstünlüklər qazandırdı. Azərbaycan öz torpaqlarını döyüş yolu ilə işğaldan azad etdi. Azərbaycan həm meydanda, həm də masada diktə edən tərəfə çevrildi. Bildiyimiz kimi, Ermənistan tərəfindən işğal edilən ərazilərimiz təbii resurslarla zəngindir. Uzun illərdir ki, Ermənistan tərəfi işğal altındakı ərazilərimizdə mövcud olan faydalı qazıntıları istismar edirdi. Kənd təsərrüfatına yararalı olan məhsuldar torpaqlarımızı əkib-becərir və buradan iqtisadi qazanclar əldə edirdi. Bir məsələyə də diqqət çəkmək istəyirəm ki, onlar işğal edilən ərazilərdən bir gün çıxarılacağını bildiyi üçün burada mövcud olan hər şeyi dağıtmağa üstünlük vermişlər. Ona görə də ilk illərdə burada iqtisadi nailiyyətlər elə də nəzərəçarpan olmasa da, infrastruktur yaradıldıqdan və kommunikasiyalar bərpa edildikdən sonra biz işğaldan azad edilmiş ərazilərin Azərbaycan iqtisadiyyatına necə töhfə verəcəyini görəcəyik. İqtisadi inkişaf layihəsini irəli sürməzdən öncə yol, qaz, su, elektrik enerjisi, rabitə və s. ümumi infrastrukturun yaradılması və qurulmasına önəm verilməlidir ki, dövlətimiz də məhz bu istiqamətdə önəmli işlər görür. Xüsusilə də üçtərəfli razılaşmanın şərtlərinə əsasən, Zəngəzur dəhlizi istifadəyə veriləndən sonra Azərbaycan diplomatik üstünlüklə yanaşı, iqtisadi üstünlük də əldə edəcək. Azərbaycanın bölgə üçün əhəmiyyəti daha da artmış olacaq. Regionun təbii landşaftı və turizm potensialı iqtisadiyyata böyük töhfələr verəcəkdir. Qarabağın özünəməxsus sənaye potensialı və su təchizatı iqtisadiyyatımız üçün çox böyük önəm daşıyır. İşğal edilmiş ərazilər qızıl, civə, mis, qurğuşun, sink, mişar daşı, sement xammalı və s. faydalı qazıntı və xammal ilə zəngindir. Bu xammal ehtiyatının istismar edilməsi ölkə iqtisadiyyatına çox mühüm töhfələr verəcək. Zəngəzur dəhlizi ölkəmizin iqtisadi inkişaf tempini yüksəltməklə yanaşı, həm də region ölkələrin iqtisadiyyatına müsbət təsir göstərmiş olacaq. Eyni zamanda yaradılmaqda olan yeni qlobal dünyanın dayanıqlı və davamlı inkişafı üçün yeni prioritet istiqamətlər müəyyənləşdiriləcək.

**Müsahibəni hazırladı: *Şahin YƏHYAYEV*, "History of science" jurnalının Baş redaktorunun müavini**